# Durğu işarələri

Durğu işarələri düzgün yazıb oxumağa, fikri kiçik fasilələrlə başqalarına-oxuyub yazanlara çatdırmağa xidmət edir. Şifahi nitqdəki intonasiya, səs ahənginin müxtəlif çalarda dəyişməsi, tonun alçalması və ya yüksəlməsi yazıda durğu işarələri ilə tənzimlənir, nitqin məzmununa danışanın daxili hiss, həyəcanının ifadəsinə yardımçı olur, yazıya aydınlıq, dürüstlük və dəqiqlik gətirir. Durğu işarələri insanın ümumi savadının və qismən nitq mədəniyyətinin əsas əlamətlərindəndir. Azərbaycan dilində durğu işarələri aşağıdakılardır:

1. **Nöqtə**

Adi intonasiya ilə deyilən, hər hansı bir fikrin və ya məlumatın bitdiyini göstərən bütün növ cümlənin sonunda qoyulur, ayırıcı funksiya daşıyır. Nöqtədən sonra fasilə edilir.

a) **Adi intonasiya ilə deyilən bütün növ cümlə növlərindən** (nəqli, adlıq, şəxssiz, qeyri-müəyyən şəxsli, ümumi şəxsli, cüttərkibli, təktərkibli, tabeli və tabesiz mürəkkəb cümlələrdən, söz cümlələrdən, bəzi məqamlarda əmr cümlələrindən və s.) sonra: Məsələn,

*Mən anamdan mətləbini açıq danışmasını xahiş etdim.*
*Yayın isti günlərinin axırı idi.*
*Diqqətini cəmləyib ətrafa bir də nəzər yetirdi.*

b) **İnisial yazılarkən ad və ata adının qısaltma formasında:**

*C.A.Əlibəyov, M.S.Ordubadi, İ.N.Məmmədli.*

c) **və sair, və ilaxır, və başqa, bu kimi, və habelə sözləri** ixtisar şəklində yazıldıqda: *və s., və i., və b., bu k., və h.* Bu ixtisarlar cümlənin sonundan savayı istənilən yerində işləndikdə durğu yox, orfoqrafik funksiya daşıyırlar. Cümlə sonunda işləndikdə təkrar nöqtə qoymaq lazım deyil. Məsələn, *Konfransa bizim institutdan da qatılmışdılar: Fərid, Asif, Ülya və s.*

d) **Rəqəm və ya hərflə bildirilən bölgülərdə:**

*1.*
*2.*
*3.*
*A.*
*B.*
*C. və s.*

e) **Söz və rəqəm kombinasiyasında:**

*Maddə 1.*

*Maddə 2.*

**Vergül** cümlə daxilində kiçik fasiləli ayırmadır.

**a)** Həmcins üzvlər arasında: Stolun üstündə kitab, dəftər, qələm var.

**b)** Tabesiz və tabeli mürəkkəb cümlələrin tərkib hissələri arasında: Uşaq ağlayırdı, çünki anası evdə yox idi. Zəng vurulmuşdu, dərs başlanmışdı, koridorlarda heç kəs gözə dəymirdi.

**c)** O, bu əvəzlikləri mübtəda vəzifəsində olub ardınca isim, sifət, sayla ifadə edilən söz işlədilərsə: O, kitabı götürdü. O, gözəl qızı uzaqdan tanıdı. Bu, onun dostudur.

**ç)** Ara söz cümlənin əvvəlində gəldikdə ondan sonra; cümlənin ortasında gəldikdə hər iki tərəfdən, cümlənin sonunda gəldikdə isə ondan əvvəl: - Əlbəttə, mən dərsi öyrənmişdim. Mən dərsi, əlbəttə, öyrənmişdim.

**d)** Hətta, ələlxüsus, habelə, baxmayaraq sözləri ilə xüsusiləşən cümlə üzvündən əvvəl gələndə: O gecikmişdi, hətta zəng vurulandan xeyli sonra gəldi.

**e)** Cümlənin əvvəlində gələn xitabdan sonra; cümlənin ortasında gələn xitabdan əvvəl və sonra, xitab cümlənin sonunda gəldikdə isə ondan əvvəl: Adil,sən axşam harada idin? Adətdir, ay oğul, gələni qarşılayarlar.

**Nöqtəli vergül** vergül fasiləyə görə nöqtə ilə vergül arasında mövqe tutur, mürəkkəb və ya geniş sadə cümlələrin nisbətən müstəqil hissələrini bir-birindən ayırmaq üçün işlədilir – cümlədə ayırıcı funksiya daşıyır.

**a)Tabesiz mürəkkəb cümlələrin tərkib hissələri arasında qoyulur, eyni zamanda vergüllə işlənən cümlələri fərqləndirir:**

*Sən o şairi çox da həqir hesab etmə; o, gəncdir, fəqət bizim kimi gənclərdən deyil (M.S.Ordubadi).*

**b)Sadə cümlələr arasında daha böyük fasilə olan zaman:**

*İkinci də, Tehrana bütün heyətlə birgə girmək məsləhətdir; ixtilafi rəy əmələ gəlməmək üçün bir yerdə bizim evə yığışıb qəti qərara gəlirik, bunu komisyon üzvləri sərhənglə görüşməmiş etmək lazımdır (M.İbrahimov).*

**c)Rəsmi və ya işgüzar sənədlərin dilində:**

*Kafedra müdirinin səlahiyyətlərinə aşağıdakılar daxildir:*

*1) açıq dərslər keçirmək, davamiyyəti nəzarətə almaq;*

*2) müvafiq universitetlərin kafedraları ilə əlaqə yaratmaq, fikir mübadiləsi aparmaq;*

*3)simpozium, kollokviumlar keçirmək.*

**d)Baş cümlə tabeli, budaq cümlə tabesiz mürəkkəb cümlə şəklində olduqda:**

*Sözləri gülməli, danışığı maraqlı olmasaydı, onun dediyinə qulaq asan olmazdı; çünki səsi qulağı dəlir, danışığı beyinə işləyirdi (Ə.Vəliyev).*

**Dırnaq** işarəsi mətndə vasitəli və vasitəsiz nitqi, sitatları, məcazi və ya şərti mənada işlədilən sözləri, qəzet, jurnal, əsər, kinofilm, opera, nəşriyyat və s. adları fərqləndirir.

**1.Vasitəli və vasitəsiz nitqdə:**

*Gecə Qulu "Mən bir Murada dəyim" – deyib getdi (İ.Əfəndiyev).*

*Müəllim bizə üzünü tutub dedi: "Yaxşı oxuyun, dərslərinizdən geri qalmayın".*

**2.Kinayə, istehza mənasını vermək üçün:**

*Hökumət nə vaxt müsəlmanı məcbur edib qızının adını Fatma əvəzinə "Fatya" qoysun və oğlunun Həsən adını dəyişdirib "Qasanka" eləsin?..Axırda həmin "Qasanka"lar və "Varya"lar böyüyüb, məclislərdə başlayacaqlar haray təpib çığırmağa: "Ay aman! Qoymayın! Hökumət ana dilimizi öyrənməyə mane olur!" ...Bəli, əzizim, bu işlərin adına "Müsəlman işi" deyirlər (C.Məmmədquluzadə).*

**3).Qəzet, jurnal, əsər, kinofilm, nəşriyyat və s. adları:**

*Möhtərəm "İrşad" kaspisində "Həyat"ın bağlanmasından söhbət açıb, müsəlmanlardan giley edirsən ki, qəzet oxumağa meyil etmirlər (C.Məmmədquluzadə).*

*"Azərbaycan" qəzeti, "Molla Nəsrəddin" jurnalı, C.Əlibəyovun "Qızıl at və torpaq" romanı, "Elm və təhsil" nəşriyyatı və s.*

**4.Gətirilən sitatlar:**

*"İsgəndər: Bəli bunlar "elm dəryasıdırlar". İndi də ki, inşaallah, siz cənabdan ölüdiriltmək elmini öyrənərlər, onda lap alim olarlar, inşaallah!" (C.Məmmədquluzadə. Əsərləri. II c., Bakı, Azərbaycan Dövlət Nəşriyyatı", 1984, s.38).*

*"Xüsusiləşmənin bir növü xüsusən, xüsusilə, ələlxüsus, o cümlədən, özü də, hətta, illah da tipli sözlərin iştirakı ilə formalaşır" (Q.Kazımov. "Müasir Azərbaycan dili. Bakı, "Elm və təhsil", 2012, s.238).*

**Tire s**intaktik konstruksiyaları bir-birindən ayırmaq, fərqləndirmək məqsədilə istifadə olunur. Yeri gəlmişkən, bəzən tire defislə səhv salınır. Defis durğu işarəsi deyildir, qoşa sözlər (*qaça-qaça, boya-başa* və s.), qısaltmalardan sonra (*ABŞ-da, AFFA-da* və s), qeyri-müəyyən miqdar saylarında (3-4, 5-6 və s.), izafət birləşmələrinin (*zərbi-məsəl, əhvali-ruhiyyə* və s.) arasında işlənir; defis orfoqrafik norma sisteminə daxildir. Tire defisdən uzun işarələnir; cümlədə qoşa nöqtə ilə müqayisə olunur, lakin tire daha çevikdir:

**1.Dialoq zamanı:**

*Dedim: – Tutmamısan dilə az məni,*
*Dedin: – Dil sevmir ki, sevən ürəkdir.*
*Dedim: – Təsəllilər ovutmaz məni,*
*Çiçəyə isti yox, bahar gərəkdir (B.Vahabzadə).*

**2.İzahedici məqamda:**
*Adamı – başdan, ağacı – yaşdan (Atalar sözü).*
**3.Həmcins üzvlərdən əvvəl:**
*Artıq bəzəkli quşlar – turac, qırqovul görünməyə başladı (Y.V.Çəmənzəminli).*
**4.Ümumiləşdirici sözdən əvvəl:**
*Hər şeyimiz mədənidir; libasımız, qiyafəmiz, ev yaşayışımız – hamısı avropalı həyatı şəklini almaqdadır (M.S.Ordubadi).*
**5.Vasitəsiz nitqdə:**
*– Bir sözün varmı? – deyə Murada müraciət etdi (İ.Əfəndiyev).*
**6.Ara cümlələrdən əvvəl:**
*Qəribədir, bu fikirdə ola-ola yenə də mənə elə gəlirdi ki, heç zaman onu – ilk sevgimi unuda bilməyəcəyəm (M.İbrahimov).*
**7.Məkan intervalı bildirən sözlər arasında:**
*Xatırladaq ki, Bakı – Tbilisi – Qars 30 oktyabr 2017-ci ildə istismara verilmiş dəmiryolu layihəsidir* **(**News Department**).**
**8.Ayların qeyri-müəyyən zamanla ifadəsində:**
*May – iyun aylarında*
**9.Rum rəqəmləri arasında zaman intervalında:**
*XV – XVI əsrlərdə*

**İki nöqtə c**ümlədə fikri aydınlaşdırmaq, ümumi fikirdən sonra onun izahını vermək məqsədi daşıyır.

**a)** ümumiləşdirici sözdən sonra:- Etnik azlıqlara: ləzgilərə, saxurlara, talışlara, kürdlərə, laklara öz ana dillərində məktəb açmağa icazə verilmişdir.

**b)** "məsələn" və onun ixtisar şəklindən ("məs.") sonra: -Belə cavab vermək lazımdır. Məsələn: Müəllim, zəhmət olmasa, mənə də söz verin.

**c)** Dialoqlarda: Əhməd: Vaqif məşqdə olmuşdu.

**ç)** Vasitəsiz nitqdən əvvəl: Dedim: “Hər baxışda, ey sənəm nədən, Qəlbimə vurursan qəmzə oxun sən”.

**Üç nöqtə b**ədii əsərlərdə üslubi priyom kimi işlədilir. Belə cümlələrdə intonasiya sona qədər deyilməmiş fikrin məzmununu açır, onun emosional gərginliyini daha da artırır. Sözü kəsib cümləni yarımçıq saxlamaq qüvvətli təsir yaradır.

**a)** Fikrin bitmədiyini bildirmək məqsədilə cümlənin sonunda: Onlar getdilər… getdilər…

**b)** Yüksək hiss-həyəcanla deyilib özündən sonrakı sözdən müəyyən fasilələrlə ayrılan xitabdan sonra. - Eh, ay ana… Məndə o bəxt hanı?...

**c)** Dialoqlarda müsahib cavab vermədikdə: - Sizə gəlimmi?... Deyəsən, eşitmədin?...

**Sual işarəsi** ritorik və ya cavab almaq məqsədilə işlənir.

**a)** Bütün sual cümlələrinin sonunda: - Məşqə gedəcəksən?

**b)** Elə sual cümlə tipləri vardır ki, onlar cavab almaq üçün deyil, nitqin təsirini artırmaq, dinləyicini düşünməyə vadar etmək məqsədi daşıyır: - Vətən və ana. Bu iki sözdən şirin və müqəddəs nə var dünyada? Ritorik və ya bədii suallar nitqin üslubi rəngarəngliyini artıran vasitədir.

**Nida işarəsi** şifahi nitqdə nidalar intonasiya ilə, yazılı nitqdə isə mətn vasitəsilə müəyyən edilir, subyektin daxili aləminin ifadəsi olan nida işarəsi, adətən, cümlənin sonunda qoyulur

**a)** Nida cümlələrinin sonunda: - Yaşasın müstəqil Azərbaycan!

**b)** Hiss-həyəcanla deyilən xitablardan sonra: -Vaqif! Ey tacidarım! Xuraman, Xuraman! Gör nəyin xəyalındasan!

**c)** Müstəqil mənalı söz kökü kimi işlənməyən, hiss, həyəcan bildirən hissəciklərdən sonra:
*A! Ooo! Of! Ax! Ox! Uy! Pah! Bəh! Xox! Ura! Oxay! Bıy! Əh! Püf! Heyhat və s.*

**Mötərizə** daha çox əsas fikri tamamlamaq, vacib tarixi olayı, cümləni əlavə izahla nəzərə çatdırmaq funksiyası daşıyır.

**1.Ara cümlədə:**

*Xəlil cavab verdi ki, əmi, (axır vaxtlar Xəlil Ağa Hüseynin öz xahişinə görə ona əmi deyərdi) o yaxşılıq ki, indiyə qədər mənim haqqımda edibsən, məni sənə həmişəlik qul edib və mən sizdən ayrıla bilməyəcəyəm (Ə.Haqverdiyev).*

**2.Obrazların davranışı və nitqi ilə bağlı:**

*Məşədi İbad (bayatı oxuyur) –*
*Ayrı düşdüm yarımdan,*
*Əl çəkmişəm yarımdan.*
*O qədər başımı itirmişəm ki,*
*Adım çıxıb yadımdan (Ü.Hacıbəyov).*

*Rüstəm bəy (hirs ilə) – Bu saat de görüm, nə cürət edib mənim evimə gəlibsən? (Ü.Hacıbəyov).*

**3.Bədii və elmi əsərlərdə sitatın mənbəyinin göstəricisi:**

*Nadir müəllimin uşaqlarının müdrik babası – Fətəli müəllimin ocağını ziyarət etmişdik (C.Əlibəyov).*

**4.Aydınlaşdırma, əlavə izah məqamında:**

*Onun (azərbaycanşünaslığın) işi həmin cümlələrin hər birinin, eləcə də bir sıra digər elmlərin faktlarından, nəticələrindən, ümumi müddəalarından istifadə etməklə Azərbaycan (və Azərbaycan xalqı) haqqında ümumi elmi təsəvvür yaratmaqdan, Azərbaycanın (və Azərbaycan xalqının!) dünyadakı universal mövqeyini müəyyənləşdirməkdən ibarətdir (N.Cəfərov).*

**5.Dramatik əsərlərin remarkalarında:**

*Pərdə qalxmazdan qabaq musiqi (səmayi-şəms) çalınır, pərdə qalxır.*

**6.Danışanın ifadə olunan fikrə münasibəti:**

*And olsun o yediyimiz çörəyə! – dedi (hərçənd mən onunla çörək yeməmişəm) (Ə.Haqverdiyev).*

**7.Tarixi illər:**

*Məhəmməd Füzuli (1494 – 1556) orta əsr Azərbaycan şairi, mütəfəkkir və filosof, Azərbaycan ədəbiyyatı tarixində divan janrının ən məşhur və görkəmli nümayəndələrindən biri.*